**UOT:** 17.03
**KBT:** 87.75
**MJ №** 156

# İctimai həmrəylik ideyası və dini-mənəvi dəyərlərin əhəmiyyəti: Heydər Əliyevin dövlət siyasətinin fəlsəfi-etik təhlili

**Anar Qafarov***

**Abstrakt.** İdeyalar və dəyərlər həm fərdi, həm də ictimai mövcudluq aspektindən mühüm anlayışlardır. Bu anlayışların ümumiyyətlə, fəlsəfədə tarix boyu geniş müzakirə obyektinə çevrilməsi təsadüfi deyildir. Cəmiyyətlərin mənəvi və siyasi mövcudluqlarının davam etdirilməsi onlara xas ideya və dəyərləri təhlil süzgəcindən keçirilməsi ilə mümkündür. Bu məqam, "İctimai həmrəylik ideyası və dini-mənəvi dəyərlərin əhəmiyyəti: Heydər Əliyevin dövlət siyasəti müstəvisində fəlsəfi-etik təhlil" adlı tədqiqatın əhəmiyyət və aktuallığını artırır. Araşdırmanın məqsədi Heydər Əliyevin siyasi strategiyası aspektindən ictimai həmrəylik ideyası və dini mənəvi dəyərlərin əhəmiyyətini fəlsəfi və etik zəmində əsaslandırmaqdır. Tədqiqatın metodunu əvvəlki tədqiqat işlərindəki dəyərləndirmə və nəticələri əsas alaraq mövzu ilə bağlı termin və anlayışları yenidən təhlil etmək təşkil edir. Məqalənin əsas tezislərindən biri odur ki, Heydər Əliyev müstəqil dövlətçiliyimizin mənəvi əsası olaraq milli-mənəvi köklərimizə bağlılığa, milli ənənələrə sadiqliyə çox böyük əhəmiyyət verirdi. Bu mənada, azərbaycançılıq ideologiyası məhz millilikə ümumbəşəriliyin ayrılmaz vəhdətini nəzərdə tutur. Belə bir ideologiya qloballaşma prosesində milli-mənəvi dəyərlərə söykənən milli xüsusiyyətlərin yad təsirlərə məruz qalaraq aşınmasının qarşısını ala, əriyib yox olması riskini azalda bilər.

**Açar sözlər:** fəlsəfə, Heydər Əliyev, milli-mənəvi dəyərlər, azərbaycançılıq, qloballaşma

## 1.Giriş

Qloballaşma prosesi cəmiyyətlər üçün labüddür. Belə bir vəziyyət, lokal və qlobal dəyərlərin transformasiyası və müxtəlif mədəniyyətlərə mənsub olan insanlar və cəmiyyətlər arasındakı münasibətlərin inkişaf

* Fəlsəfə üzrə fəlsəfə doktoru, dosent,
Azərbaycan İlahiyyat İnstitutu, "Dinşünaslıq" kafedrasının müdiri; Bakı, Azərbaycan
E-mail: anargafarov@ait.edu.az
https://orcid.org/0000-0002-3113-1287

**Məqaləyə istinad:** Qafarov, A. [2023] İctimai həmrəylik ideyası və dini-mənəvi dəyərlərin əhəmiyyəti: Heydər Əliyevin dövlət siyasətinin fəlsəfi-etik təhlili. *"Metafizika" jurnalı, 6*(1), səh.91-108.

***Məqalənin tarixçəsi:***
*Məqalə redaksiyaya daxil olmuşdur: 12.01.2023*
*Təkrar işlənməyə göndərilmişdir: 10.02.2023*
*Çapa qəbul edilmişdir: 10.03.2023*

etməsi baxımından müsbət bir hadisədir. Lakin bu proseslə dil, rəng, etiqad, mədəniyyət, məzhəb, təriqət və iqtisadi cəhətlərdən ortaya çıxan müxtəlifliyin ictimai vəhdət zəminində həll edilməsi bir o qədər də asan olmayan bəzi problemləri ortaya çıxacağı da istisna edilmir. Belə ki, qloballaşma prosesində özünü və dünyanı yenidən inşaetmə qayəsi ilə yola çıxan insan, varlıq aləmindəki elmi kəşf və icadlarıyla mədəni həyat tərzini və insan həyatını asanlaşdırmaqla yanaşı, digər tərəfdən elmi və texnoloji kəşflər sayəsində güc əldə edib, zamanla metafizikadan bağını qoparaq, həddindən artıq dünyəviləşmişdir. Beləcə insanlıq metafizik hədəfindən uzaqlaşdı. Nəticə etibarilə insanın ülvi mənliyinin inşası yerini süfli mənliyi olan eqonun inşasına, "bizmərkəzli" həyat fəlsəfəsi "mənmərkəzli" həyat fəlsəfəsinə, bir dəyər olaraq həqiqətin və humanist dəyərlərin mərkəzə alındığı dünyagörüşü vaxt keçdikcə yerini əşyamərkəzli bir dünyagörüşünə tərk etdi. İnsan övladının özünə yadlaşmasını ehtiva edən "mənmərkəzli" həyat fəlsəfəsi nəticədə kapitalizmi ortaya çıxardı. Mahiyyəti etibarilə əşyamərkəzli dünyagörüşü ehtiva edən kapitalist zehniyyət əşyaya və ya kapitala sahib olmaq naminə dəyərli bir varlıq olan insanı vaxt keçdikcə əşyaya sahib olma yolunda vasitə halına gətirərək dəyərsizləşdirdi. Belə bir vəziyyət ictimai münasibətlərin mənəvi toxmalarını aşındıraraq sosial vəhdət baxımından böyük sıxıntı olan *"mən və özgəsi"* problemini də özüylə birlikdə gətirdi. Beləliklə mədəni müxtəliflik, demokratiya və insan hüquqları və azadlığı mövzusunda keçirilən bir çox siyasi müzakirələrə baxmayaraq dünyamız şiddət, zülm, ədalətsizlik, özgələşdirmə, huquq bərabərsizliyi, marjinallaşdırmayı nümayiş etdirən mənfi hallar və münasibət formalarıyla çalxalanan bir planet halına gəlmişdir. [Bax: Qafarov, A. 2016. s.87-91]. Bu mənada, ictimai vəhdət və həmrəyliyi canlandırcaq əsas dəyər və prinsiplərin təkrar nəzərdən keçirilib dəyərləndirilərək elmi müzakirə obyektinə çevrilməsi olduqça əhəmiyyətlidir.

Sözsüz ki, bu istiqamətdə müxtəlif tədqiqatlar aparılmış, məqalə və kitab olaraq nəşr edilən müxtəlif əsərlər elmi ictimaiyyətə təqdim edilmişdir. Bunlar arasında Rəhman Bədəlovun *"Birgə yaşayış və ya adamlar demokratiya yoluna necə çıxdılar?"* [Bakı: Tutu nəşriyyatı, 2001], İbrahim Kalının *"İslam və Batı"* [İstanbul: TDV İSAM Yayınları, 2015], *"Ben öteki ve ötesi-İslam-Batı ilişkileri tarihine giriş"* [İstanbul: İnsan Yayınları, 2016], Orhan Atalayın *"Doğu-Batı kaynaklarında birlikte yaşama"*, Anar Qafarovun *"Din ve Felsefe Toplumu Bütünleştirici Değerlere İlişkin Bir Bilinç İnşa Edebilir mi?"* [Din araşdırmaları jurnalı, Azərbaycan İlahiyyat İnstitutu, 2018, s. 265-288], *Heydər Əliyev və çağdaş Azərbaycan Dövlətçiliyi* (həmmüəliflər A.Qafarov vb., editor: Səyyad Aran, İstanbul:

Azərbaycan İstanbul Başkonsolosluğu, Kutup Yıldızı Nəşriyyatı, 2007), Hidayət Orucovun *“Milli-mənəvi dəyərlərə qayıdış”* [Heydər Əliyev və Azərbaycanda din siyasəti: gerçəkliklər və perspektivlər, DQİDK, Bakı 3-4 aprel, 2007], Mübariz Qurbanlının *“Heydər Əliyev Azərbaycançılıq ideologiyası və mənəvi dəyərlər”* [Bakı: Tuna nəşriyyatı, 2018], Mehman İsmayılov və Ceyhun Əliyevin həmmüəllifliyi ilə hazırlanmış *“Mənəvi dəyərlər İlham Əliyev siyasətinin tərkib hissəsi kimi”* [Bakı: Tuna nəşriyyatı, 2018], Gündüz İsmayılovun *“Tolerantlıq: Bildiklərimiz və bilmədiklərimiz”* [Bakı: Nurlar nəşriyyatı, 2014] və *“Azərbaycanda dini məsələ: təhdidlər və hədəflər. İdeoloji, milli, ictimai təhlükəsizlik müstəvisində”* [Bakı: Tuna nəşriyyatı, 2020] adlı əsərlərini qeyd etmək olar. Əlbəttə sözügedən əsərlərin bir qismində ictimai həmrəylik (və ya birgəyaşayış) ideyası və onun mahiyyətinə dair ümumi təsəvvür formalaşdırılmış, Şərq və Qərb ictimai mühitindəki real hadisələrə əsaslanaraq müəyyən sosioloji və müqayisəli təhlillər aparılmış, digər qismində isə ictimai həmrəylik məsələsi və milli mənəvi dəyərlər daha çox Azərbaycançılıq ideologiyasının tərkib hissəsi kimi araşıdırılmış, bu məsələnin ideoloji bir amil kimi əhəmiyyətindən bəhs edilmişdir. Bütün bunları nəzərə alaraq tədqiqatımız çərçivəsində günümüzdə ictimai həmrəyliklə əlaqədar dəyərlər zəminində hansı problemlərin olduğu və onların əsasında hansı amillərin olduğu məsələsi, ictimai həmrəyliyi meydana gətirən prinsiplərin hansı əsas milli-mənəvi dəyərlər üzərində inşa edilməsinin mümkün olacağı kimi mövzular müzakirə obyektinə çevrilmiş, bu mənada, nümunə kimi ümummili lider Heydər Əliyevin bu istiqamətdəki dövlət strategiyası fəlsəfi və etik aspektlərdən təhlil edilmişdir. Bütün bu məsələlərin fəlsəfi və dini mətnlərin analizi və sintezi vasitəsilə fəlsəfi, teoloji və etik müstəvidə izah edilməsi tədqiqatın əsas metodlarından biridir. Bu metoda əsasən filosofların cəmiyyətdə ictimai həmrəyliyə zərər verən “mən” və “özgəsi” kimi anlayışları tənqid etmənin nəzəri əsaslarını təşkil edən və ictimai həmrəyliyə xidmət edən dəyərlərlə əlaqədar görüş və düşüncələri fəlsəfi, teoloji və etik prinsiplər əsasında analiz edilərək ortaya qoyulacaqdır. Bununla yanaşı tədqiqat prosesində qeyd edilən istiqamətdəki nəzəri açıqlamalar tarixi təcrübələrdən nümunələr gətirilməklə müəyyən qədər əsaslandırılmışdır.

Mövzunun əhəmiyyətini ortaya qoymaq məqsədilə, burada, hər şeydən əvvəl, dünyada ictimai həmrəylik sahəsində bəşəriyyətin qarşılaşdığı problemlərə dair ümumi mənzərəyə diqqət çəkmənin müvafiq olacağını düşünürük.

## 2.İctimai həmrəylik ideasının fəlsəfi arxa planı

Bir tədqiqatı mənalandıran cəhətlərdən biri onun insan zenhinində bir sual ətrafında şəkillənməsidir. Bu mənada "İnsan nə üçün sosial-mədəni halda vəya bir cəmiyyət halında yaşamağa məhkumdur?" şəkilndə bir sual ortaya qoymaqla tədqiqat obyektinin müzakirəsinə başlamaq olduqca əhəmiyyətlidir. Çünki bu suala veriləcək cavab məqaləmizin əsas tədqiqat obyektinin sosial-fəlsəfi aspektdən əsaslandırlması üçün nəzəri bir zəmin hazırlamış olacaqdır.

Qeyd edilən sualın cavabı bilavasitə insanla bağlı olduğu üçün hər şeydən əvvəl "İnsan nədir və necə bir varlıqdır? kimi bir sualla işə başlamaq olduqca məntiqlidir. Çünki bu sualın cavablandırılması yuxarıdaki sualın cavabını özündə ehtiva etməklə yanaşı, sosial-mədəni həyatın və ictimai vəhdətin əhəmiyyətini və dəyərini də ortaya qoyacakdır.

İnsanın mahiyyətinə dair sual qədim dövr Yunan filosofları Əflatun və Aristotel, İslam filozoflarından Fərabi, İbn Sina, Qəzali, İbn Miskəveyh, Nəsirəddin Tusi və hətta İbn Xəldun və müasir dövr dünya filosof və müdriklərini düşündürən məsələlərdən biridir. Ontologiyanın ən əhmiyyətli mövzularından biri olan bu məsələyə dair verilən cavablardan ikisi demək olar ki bir çox filosofun üzərində ittifaq etdiyi fikirlərdən biridir. Bunlardan birincisi insanın düşünən bir varlıq olması, digəri isə onun varlığı etibarilə sosial və ya mədəni bir varlıq olması istiqamətindəki fikirdir. Bu cavablar arasında xüsusilə ikinci tərif mövzumuzu bilavasitə maraqlandırır. Mənbəsi etibarilə Platon və Aristotelə aid olan tərifdən məlum olur ki, insan bir cəmiyyətdə başqa insanlarla birlikdə və vəhdət halında yaşamağa ontoloji olaraq məhkumdur. [Fərabi, 1986. s.117-119; Mücahid,H.T. 2005. s.58; İbn Miskəveyh, 1978. s.149.]. Çünki insan varlığı etibarilə öz-özünün bütün ehtiyaclarını qarşılayacaq gücdə deyil. Bundan əlavə olaraq insanların ontolojik olarak eyni qabilliyyətlərə malik olmaması həyatın müxtəlif ehtiyacları istiqamətində sosial münasibətlərlər ağını zəruri hala gətirir. Qurani Kərimdə də *"Şübhəsiz ki, sizin iş, çalışma və çəhdləriniz əlbətdə fərqli fərqlidir"* [Leyl 92/4] şəklində qeyd olunan bu məsələ həm insanlar üçün sosial mədəni həyatın labüdlüyünü, həm də bir cəmiyyətdə sosial mədəni statusların formalaşmasının təbii olduğu düşüncəsini ifadə edir [Fərabi, 1980. s. 43.; Skirbekk,G. & Gilje,N., 2006. s.109].

İnsanın sosial bir varlıq olması və sosial-mədəni həyatın vacibliyi özlüyündə sosial-mədəni vəhdəti də zəruri hala gətirir. Çünki sosial münasibətlər ağı yalnız sosial vəhdəti əks etdirdiyi ölçüdə sağlam olabilər. Əks halda heç bir sosial-mədəni münasibətlərdən söz edilə bilməz. Bu mənada sosial vəhdətin mahiyyətinə dair qısa bir icmal vermək münasib olar.

Sosial vəhdət, bir cəmiyyətdə bütün fərd, qrup və sosial strukturun bütün ünsürləri ilə maddi-mənəvi mədəniyyət ünsürlərinin ortaq bir məxrəcə gələrək, funksional bir tamlıq vəya bütövlük meydana gətirəcək şəkildə bir-birilərini tamamlamaları və qaynayıb qarışmalarıdır. Bir cəmiyyətin gələcəyi və uzunmüddətli varlığı yalnız belə bir bütövlük və qaynaşma şəraitində mümkündür. Sosial-mədəni vəhdət bir birindən ayrı olan hissələrin bir birlik halına çevrilməsini digər bir ifadə ilə: bir cəmiyyətdə fərdlərinin və sosial qrupların birliyini, bütövlüyünü və ya bir birilərini tamamlamalarını təmin edən prosesdir. Başqa bir aspektən sosial-mədəni vəhdət, bir cəmiyyətdə və sosial qrup daxilində üstün olan mədəni dəyərlərin cəmiyyəti meydana gətirən fərdlər tərəfindən qəbul edilərək mənimsənilməsi və insanların əldə etdikləri sosial-mədəni dəyərlərə müvafiq şəkildə yaşamasıdır [Günay, Ü. 2012. s.454-455]. Bu mənada, qeyd edilə bilər ki, sosial-mədəni vəhdətdə bir mədəniyyətin maddi dəyərləriylə yanaşı mənəvi dəyərləri də olduqca əhəmiyyətlidir. Cünki hər hansı bir cəmiyyətdə və sosial qrupda əxlaq, din, dil, sənət, ədəbiyyat, hüquq və təhsil kimi mənəvi dəyərlər birbirilərini tamamlayaraq fərdlər arasında sosial-mədəni qaynaşma və uyum meydana gətirmədiyi təqdirdə sosial münasibətlər ağı ideya və məqsəd birliyinin funksional olduğu bir sahə olmaqdan çıxıb, məhdudiyyət qoyulmayan şəxsi seçim, arzu və tələbatların hökmranlıq edəcəyi bir münasibətlər ağına çeviriləcəkdir. Bu mənada, cəmiyyətdə sosial vəhdət eyni məkanda yaşamaqla deyil, cəmiyyətin nüvəsini təşkil edən fərdlərin məkanından asılı olmadan müştərək ideya, maraq, hədəf vəya amal ətrafında həmrəylik göstərərək bir araya gəlmələrini ifadə edir. Buna görə də məkan mərkəzli vəhdət həqiqi vəhdəti əks etdirmir. Nüvəsini mənəvi dəyərlərin təşkil etmədiyi belə bir vəhdət formal vəhdətdir və özlüyündə güçlü sosial partlayışlara və çaxnaşmalara hamilədir. Bu fikrə əsasən deyə bilərik ki, hətta xarici təsirlərlə meyadana gələn sosial vəhdəti də məkan mərkəzli vəhdətlə xaraktercə müştərək keyfiyyətli hesab etmək olar. Belə ki, dinləri, etiqadları, adət-ənənələri, milli-mənəvi dəyərləri, tarixləri birbirindən fərqli olan millətlərin avtoritar bir rejimin əsarəti altında özlərinə yad olan mədəni dəyərləri qəbul etməyə məcbur edilmələri və buna görə səmimi münasibətlərə əsaslanmayacaq şəkildə həmrəylik nümayiş etdirmələri xarici təsirlərlə meydana gələn izafi bir vəhdətdir. Belə bir keyfiyyətdəki vəhdət izafi vəhdət olub eynilə məkan mərkəzli vəhdət kimi sağlam dəyərlər üzərinə inşa edilməmişdir və parçanmağa məhkumdur. Belə cəmiyyətlərin mövcudluğunun ömrü həmin rejimin mövcudluğu qədərdir.

## 3.Heydər Əliyevin həmrəylik və dini-mənəvi dəyərlər strategiyası

İnsan öz məhdud dünyasıyla bərabər ictimai hadisələrin və proseslərin də aktyorudur. Lakin o bu aktyorluq müddətində sadəcə öz təcrübələri və fəaliyyətləri ilə hərəkət edə bilməz. Çünki insan fiziki bir varlıq olduğu kimi, fövqəlmaddi bir həqiqət ilə əlaqədar xüsusiyyətlərə də malikdir. İnsanın bu xüsusiyyətlərini və güçünü yaradılış məqsədinə müvafiq olaraq fərq edib inkişaf etdirməsi lazımdır. Lakin onun, bu fərqindəliyi öz tənhalığı içində həbs olunmuş bir subyektivlik içində tapması və əldə etməsi mümkün deyildir. Bir çox məsələdə olduğu kimi, bu mövzuda da yaxın və uzaq içtimai mühitindəki insanların köməyinə ehtiyacı vardır. Azərbaycan Türk-İslam mədəniyyətində cəmiyyətin mənəvi lideri olan şəxsiyyətlər fərdə içtimai mühiti ilə qurduğu münasibətdə rəhbərlik edən mühüm aktyorlardır. Müasir dövrdə rəhbərliyi ilə yol göstərici keyfiyyəti ilə önə çıxan şəxsiyyətlərdən biri də Heydər Əliyevdir. Bu tədqiqatımızda Azərbaycan Respublikasının sabiq prezidenti Heydər Əliyevin milli mənəvi dəyərlər istiqamətindəki siyasi strategiyası və onun içtimai-mədəni vəhdətin əsasını təşkil edən fikir və düşüncələr sosial-fəlsəfi, həmçinin etik zəmində funksional və sensual vəhdət prizmalarından analiz ediləcəkdir. Lakin hər şeydən əvvəl sosial, funksional və sensual vəhdətin mahiyyətinin açıqlanmasının məsələyə aydınlıq gətirilməsi və elmi tədqiqat metodları baxımından əhəmiyyətli olacağını düşünürük. Buna görə də tədqiqatımızın ilkin mərhələsində sosial-mədəni, funksional və sensual vəhdət konsepsiyalarının mahiyyətini oraya qoymağa çalışacağıq.

Funksional vəhdət bir cəmiyyətdə müxtəlif iş sahələrində fəaliyyət göstərən fərd və qrupların ictimai həyatın təbiəti gərəyi yerinə yetirməklə məsul olduqları vəzifələri layiqincə həyata keçirmək üçün əmək fəaliyyətlərindən və cəhdlərindən meyadana gələn vəhdətdir. Sözsüz ki, burada cəmiyyətin hər növ normları, prinsipləri, qrumları və dəyərləri əhəmiyyətli dərəcədə rol oynamaqdadır. Buna görə də funksional vəhdət və ya birlik, mədəniyyət ünsürlərinin içtimai mexanizmasını ahəngli bir şəkildə funksional vəziyyətə gətirəcək daxili idrak nəticəsində meydana gələn içtimai inteqrasiyanı ifadə etməkdədir [Çapcıoğlu, İ. 2016. s.517]. Bu mənada bir avtomobili hərəkətə gətirən hər bir hissəsinin öz funksiyasını lazımı şəkildə yerinə yetirərək avtomobilin işləməsini müştərək şəkildə meydana gətirməsi hadisəsini nümunə göstərmək olar. Bu numunəyə əsaslanaraq deyə bilərik ki, funksional vəhdət və birlik funksiyaya əsaslanan bir vəhdət və bütövlüyü əks etdirir. Əgər avtomobili hərəkətəgətirici hissələrindən hər hansı biri avtomobildən çıxarılarsa, bu avtomobilin ümümi mənzərəsində bir dəyişikliyi əks etdirməsə də onun hərəkət etməsində nöqsanlığa səbəb olar. Bundan

əlavə, avtomobildən çıxarılan hissə, avtomobil xaricində öz funksiyasını icra edə bilmədiyi üçün də bir məna ifadə etməz. Eynilə bunun kimi bir cəmiyyətdə müxtəlif iş sahələrində meydana gələcək hər hansı bir əksiklik, bir axsama və durğunluq, içtimai strukturda və funksionallıqda bəzi əhəmiyyətli narahatçılıqlara, nöqsanlara və cəmiyyəti vahid bir varlıq kimi ayaqda tutan bəzi maddi-mənəvi dəyərlərin zəifləməsinə və ortadan qalxmasına səbəb ola bilər. Qısacası funksional vəhdət fərd və qrupların aralarında meydana gətirdikləri iş bölümü ilə izah edilə bilər. Ancaq bir cəmiyyətdə funksional vəhdətin sadəcə iş bölgüsü sayəsində reallaşması mümkünsüzdür. Çünki bir cəmiyyətdə ictimai münasibətlərin dinamikasını təşkil edən sosial problemlər və ehtiyaclar, dövr keçdikcə yeniləri ilə əvəz olunur və dəyişir. Belə bir səhnə özlüyündə problemlərin həll edilməsi istiqamətində iqtisadi, siyasi, dini, milli-mənəvi dəyərlər, təhsil və s. kimi sahələrdə yeni tədbirlərin alınmasını labüd hala gətirir. O halda sosial-mədəni münasibətlər ağının sağlam olabilməsi üçün funksional vəhdətlə yanaşı məna mərkəzli (sensual) vəhdət də xüsusilə böyük əhəmiyyət kəsb edir. Bu mənada tədqiqatın bundan sonrakı hissəsinin sensual vəhdətin mahiyyətinə dair sosial-fəlsəfi təhlil ilə davam etdirilməsi daha uyğun olar.

Funksional vəhdətin mövcud olduğu son dərəcə ixtisaslaşmış bir cəmiyyətdə, iş bögüsü o qədər kompleksli və funksiyalar o qədər bir birinə bağlıdır ki, qeyd edilən funksiyaların hərhansı birində meydana gələn bir nöqsan, cəmiyyətin normal funksionallığını əhəmiyyətli dərəcədə sükuta məruz qoya bilər. Bundan əlavə bir cəmiyyətdə fərd və sosial qruplar öz funksiyalarına əsaslanaraq bir biriləriylə sıx şəkildə bağlı olsalar da bəzən bir mexanizmanın çarxları kimi bir birinə hissiz, laqeyd və anlayışsız ola bilirlər. O halda bir cəmiyyəti təşkil edən ünsürlər, fərd və sosial qruplar sadəcə funksiyalarına görə deyil, bir məna ərtafında bütünləşərlərsə, yəni müştərək mədəni ünsür və dəyərlərdən ibarət xarakter etibarilə bir- birilərini tamamlayarlarsa, cəmiyyət sağlam bir struktur əldə edərək bölünüb parçalanmadan öz varlığını davam etdirə bilər.

Cəmiyyət içində fərd vəya qrupları tək bir orqanizm kimi bir araya gətirəcək vəhdət, funksional baxımdan birbirini tamamlayan mexanizmin heç bir axsaqlığa məruz qalmadan işləyə bilməsi və cəmiyyəti təşkil edən müxtəlif ünsür və qrupların müştərək dəyər hökümləri, normalar, qanunlar və müştərək bir əxlaqi anlayışla cəmiyyət üzvlərinin bir-birilərilə qaynayıb qarışmasından doğan *“məna ətrafında və ya məna mərkəzli vəhdət”*dir. Əsasən cəmiyyətin həmrəy olmasına şərait yaradan amil də elə məhz bu növ birlikdir. Çünki, mənamərkəzli vəhdət mənəvi vəhdətlə yanaşı maddi birlik və bərabərliyi də özündə ehtiva edir. Belə bir bütünləşmə növündə

cəmiyyətdəki müxtəlif ünsürlər sadəcə müəyyən funksiyaları icra etmək üçün deyil, eyni zamanda daşıdıqları şəxsi xarakter etibarilə bir birilərini tamamlamaq üçün bir yerdədirlər. Sosioloqların bir çoxu mənamərkəzli ictimai vəhdətin sosio-mədəni vəhdətin ən ideal şəkli olduğunu qəbul edirlər. Belə bir vəhdət həm davamlı, həm də bu davamlılığı təmin edən çuğlaşdırıcı və gücləndirici bir özəyə malikdir. Milli-mənəvi dəyərlər cəmiyyətdə bir məna ətrafında bütünləşmək üçün mədəniyyət ünsürləri arasında əhəmiyyətli bir yerə malikdir. [Günay, Ü. 2012. s.409-420].

Sosial-mədəni vəhdət növləri arasında ideal tip olarak yuxarıda ələ aldığımız funksional və məna ətrafında vəhdətin Heydər Əliyevin milli-mənəvi dəyərlər istiqamətindəki siyasi strategiyasında əhəmiyyətli bir yerə sahip olduğunu görürük. Onun bu istiqamətdəki siyasi strategiyasının bünövrəsində Azərbaycan cəmiyyətinin kollektif hafizəsini və ictimai şüurunu təşkil edən dini və milli mədəni ünsürlərin birliyi ideyası yatır. Belə bir birlik şüurunun siyasi və praktik təcəssümü 28 may 1918-ci ildə Şərqdə ilk demokratik respublika olaraq qurulan Azərbaycan Xalq Cümhuriyyətinin varisi olan Azərbaycan Respublikasının prezidenti kimi Heydər Əliyevin siyasi fəaliyyətində də özünü bariz bir şəkildə göstərməkdədir. Belə ki, onun nümunə kimi diqqətə layiq olan müəyyən fikir və ifadələrində bunu açıq şəkildə görmək mümkündür. Sovetlər Birliyinin dağılması nəticəsində ateizmin təlim və təbliğatlarının ağırlıq təşkil etdiyi bir cəmiyyətdən milli-mənəvi dəyərlərə daha çox ağırlıq verən bir cəmiyyətə keçidin Sovetlər birliyinin əsarətindən qurtularaq müstəqilliyini yeni elan etmiş (18 oktyabr 1991) ölkəmiz üçün bir o qədər də asan olmadığını nəzərə alsaq, müstəqillik tariximizdən etibarən başlayan özünəqayıdış və özünüdərk prosesinin daha sonra xususilə Heydər Əliyevin milli-mənəvi dəyərlər zəminindəki dərin siyasi fəaliyyətləri sayəsində müvəffəqiyyətlə davam etdirilməsi təqdirəlayiq bir haldır. Onun bu istiqamətdə reallaşdırdığı siyasi strategiya həmin dövrdə Sovetlər birliyinin Şərq mədəniyyətinə böyük töhfələr vermiş Azərbaycan cəmiyyətini özünəyadlaşdırma siyasətinin təsirindən hələ də tam qurtulmayan vətəndaşlarımızın müstəqilliyin yeni əldə edildiyi bir dövrdə zamanın ziddiyyətlərinə ram olmamaları üçün olduqça əhəmiyyətli idi. Belə ki, məlum olduğu üzrə post-sovet dövrünün əvvəllərində Azərbaycanda vaxtilə Sovetlər birliyinin hakim ideologiyasına xidmət edən, şüurlu və şüursuz şəkildə Sovetin özünəyadlaşdırma siyasətinin təbliğatçısına çevrilən bəzi insanlar yolayrıcında qalmışdılar. Belə bir vəziyyətdə insanların zehnində iki mühüm sual doğdu: Keçmişə əlvida deyib yeni dövrün strategiyasına müvafiq şəkildə yol xəritəsi müəyyənləşdirib yaşamaqmı, yoxsa keçmişlə yaşamaqmı daha doğrudur? Cəmiyyətlərin ekzistensiyası baxımından olduqca əhəmiyyətli

olan bu sual, var olmanın mahiyyət və keyfiyyətini müəyyənləşdirəcək intellektual refleksiyanın bir ifadəsi idi. Heydər Əliyevin post-sovet dövrü Azərbaycanda milli-mənəvi dəyərlər istiqamətində icra etdiyi siyasi strategiya Azərbaycan cəmiyyətinin varlığını məhz öz milli-mənəvi dəyərlərinə əsaslanaraq gələcəyə daşıyabiləcəyi ideyasını daşıyırdı. Müstəqilliyinin ilk günlərindən etibarən milli-mənəvi dəyərlərə münasibətin müsbət istiqamətdə dəyişdiyi və ateizm buxovlarının getdikcə qırılma prosesinin yaşandığı ölkəmizdə 1993-cü ildə yenidən iqtidara gələn Heydər Əliyevin bu istiqamətdəki siyasi addımlarıyla milli-mənəvi dəyərlər zəminində yeni bir mərhələyə qədəm qoyuldu. Bu dövrü ölkəmizin mənəvi mədəniyyətinin intibahı kimi qiymətləndirsək, mübaliğə etmiş olmarıq. Belə ki, Heydər Əliyevin postsovet Azərbaycanında rəhbərliyi dövründə insan hüquq və azadlıqlarına, din və vicdan azadlığının bərqərar olmasına, milli-mənəvi dəyərlərimizin mühafizəsinə və gənclərimizin bu dəyərə müvafiq şəkildə yetişdirilməsi dövlətimizin əsas hədəflərindən biri idi. Bu mənada, onun ölkə gənclərinin I forumunda dilə gətirdiyi fikirlər böyük əhəmiyyət kəsb edir:

> *“Gənclərimizi dinimizi olduğu kimi öyrənməli, qəbul etməli və ondan istifadə etməlidirlər. Biz heç vaxt imkan verə bilmərik ki, ayrı-ayrı şəxslər, ayrı-ayrı qüvvələr öz şəxsi mənafelərini güdərək İslam dini pərdəsi altında Azərbaycan gənclərinin tərbiyəsini və mənəviyyatını zədələsinlər.* [Orucov, H. 2007, s.72].

Bu fikirlər cəmiyyətdə mənamərkəzli sensual vəhdətin nəzəri zəminini formalaşdırması baxımından olduqca əhəmiyyətlidir. Bundan əlavə, qeyd olunduğu üzrə bəzi şəxs və qrupların cəmiyyəti mənəvi zəmində parçalamağa xidmət edəcək fikir və planlarının reallaşdırılmasına izin verilməməsi istiqamətində çıxışda yer alan təkidli ifadələr özlüyündə sadəcə dövlət rəhbərinin deyil, eyni zamanda cəmiyyətimizin hər bir fərdinin funksional vəhdət istiqamətində üzərinə düşən öhdəliyi icra etməsinin vacibliyini də dilə gətirir.

Heydər Əliyev milli-mənəvi dəyərlərin ən həssas nöqtəsi olan dinimizi xalqımızın milli-mənəvi sərvəti kimi qiymətləndirir, onu cəmiyyətin existensiyasının qarantı olan ən mühüm və həssas sahə kimi görürdü. Onun siyasi kursuna görə xalqımızın və ölkəmizin daim var olması sahib olduğu etiqad və dininə məsafəli olmamasıyla və mənəvi dəyərlərimizdən faydalanmaqla düz mütənasibdir [H.mlf., “a.k.m” s.72]. Belə bir dövlət fəlsəfəsində milli ideologiya və siyasətin tərkib hissəsini təşkil edən belə bir siyasi kurs, milli-mənəvi və xusunsilə də dini dəyərlər bir xalqın ən mühüm istinadgahı kimi qəbul edilirdi. Bu mənada, din Azərbaycan xalqının milli-

mənəvi sərvətidir. Mənəvi dəyərlərimiz ölkəmizin gələcəyinin əsasını təşkil edir. Bu xusus, Heydər Əliyevdən iqtibas etdiyimiz bu fikirlərdə də özünü açıq şəkildə biruzə verir.

*"Biz dini ilk növbədə mədəniyyətin, tarixi irsin, milli mentalitetimizin bir fenomeni və ayrılmaz bir hissəsi kimi qəbul edirik. Biz Azərbaycanda öz milli-mənəvi dəyərlərimizə söykənərək, eyni zamanda xalqımızın elminin, mədəniyyətinin inkişafına, milli-mənəvi dəyərlərin ümumbəşəri dəyərlərlə zənginləşməsinə və vəhdətinə xüsusi əhəmiyyət veririk"* [H.mlf., "a.k.m" s.73, 76].

Müstəqil Azərbaycan Respublikasının prezidenti olduğu dövrlərdə İslam dininin mənəvi dəyərlərinin əhəmiyyətini və öyrənilməsinin zəruriliyini dilə gətirən Heydər Əliyev 2 fevral 1996-cı ildə müstəqil Azərbaycan Respublikasının birinci formunda söylədiyi fikirlər diqqətə layiqdir:

*"Bizim Konstitusiyamıza görə ölkəmizdə dünyəvi dövlət qurulur, din dövlətdən ayrıdır. Təbii ki, bütün dünyəvi ölkələrdə bu belədir. Bu, heç kəsdə təəccüb doğurmasın. Bu, bizim dinə münasibətdə başqa bir mövqe tutmağımızı göstərmir. Ancaq gənclərimizin islam dinini mənimsəmələri üçün hesab edirəm ki, lazımi tədbirlər görülməlidir. Çünki bu tədbirlərin olmaması nəticəsində bəzi mənfi hallar meydana çıxır, ayrı-ayrı qruplar gənclərə fanatizm əhval-ruhiyyəsini aşılamaq istəyirlər və bunlar da bizim gənclərimizin tərbiyəsinə zərər vurur. Ona görə də İslam dininin məktəblərdə tədris olunması, hesab edirəm ki, günün tələblərindən biridir və bu barədə Təhsil Nazirliyi, müvafiq təşkilatlar düşünməlidirlər, lazımı tədbirlər görməlidirlər. Yəni bizim gənclərimiz, dinimizi olduğu kimi öyrənməli, qəbul etməli və ondan istifadə etməlidirlər. Biz heç vaxt yol verə bilmərik ki, ayrı-ayrı şəxslər, ayrı-ayrı qüvvələr öz şəxsi mənafelərini güdərək İslam dini pərdəsi altında Azərbaycan gənclərinin tərbiyəsinin zədələnməsinə gətirib çıxarsınlar"* [Əliyev,H.1996.3 fevral].

Heydər Əliyev milli-mənəvi və dini dəyərlər istiqamətindəki siyasi fəaliyyətində ümumbəşəri dəyərləri də gözardı etmirdi. Belə ki, onun dövlət siyasəti təkqütüblü olmayıb, mahiyyəti etibarilə mədəni-mənəvi müxtəlifliyi və multikulturalizmi də özündə ehtiva edən bir tərkibə malik idi. Bu mənada, onun 26 avqust 1994-cü ildə həzrəti Peyğəmbərimizin mövludu ilə əlaqədar bir çıxışında dilə gətirdiyi və bizim də indi bilavasitə iqtibas edəcəyimiz ifadələr fikirlərimizin əsaslandırılması baxımından diqqətəlayiqdir: *"İslam dini başqa dinlərə qarşı heç vaxt düşmən olmamışdır. Çünki, bu dinlərin hamısı Allahdan gəlir. Azərbaycanda müsəlmanlarla yanaşı başqa dinlərə etiqad edən adamlar da yaşayır. Onlar da Azərbaycanın bərabərhüquqlu vətəndaşlarıdır. Çalışmalıyıq ki, dini, milli mənsubiyyətindən asılı olmayaraq*

*Azərbaycanın bütün vətəndaşları eyni hüquqlu olsunlar və onların hamısının birliyini, vəhdətini təşkil edək. Bu da Allah-Təalanın buyurduğu, bizim yolumuzdur”* [H.mlf., “a.k.m” s.73-74.]. Bu ifadələri sosial-fəlsəfi və etik perspektivlərdən təhlil etsək görərik ki, bu çıxış özlüyündə funksional və mənamərkəzli (sensual) vəhdətə dair subliminal mesajlar ehtiva edir. Çıxışın sonunda keçən ifadələrə diqqət yetirsək, burada vurğulanan vəhdət mesajının teolojik və hüquqi perspektivdən əsaslandırıldığını da bariz bir şəkildə görəcəyik. Heydər Əliyevin bu və ya digər qəbildəki çıxış və ifadələrindən məlum olur ki, onun funksional və sensual vəhdət istiqamətindəki fikir və düşüncələri köklü dəyərlərimizdən olan multukulturalizmi də özündə tərənnüm edir. Belə ki, onun qeyd edilən məzmundaki çıxışlarında ümumiyyətlə insanların dini, mədəni mənsubiyyətindən asılı olmayaraq başqa dinlərə, mədəniyyətlərə, mənəvi dəyərlərə və adət-ənənələrə hörmət bəsləmələri və dözümlü olmaları tövsiyə edilir. Bu mənada, dini zəmində hər hansı bir ədavət və münaqişə yolverilməzdir. [H.mlf., “a.k.m” s.84.]. Heydər Əliyevin milli və dini bayramlar münasibəti ilə müxtəlif məzhəb və konfessiyalardan olan insanlar arasında olması, ölkəmizdə məscidlərlərlə yanaşı kilsə və sinaqoqların tikinti və bərpasına dəstək verməsi, 90%-i müsəlman olan ölkəmizdə 2166 məscidlə yanaşı, 40-dan artıq kilsə, sinaqoq və ibadət evlərinin və ölkəmizdə yaşayan xalq və millətlərin dini keçmişləri ilə bağlı 500-dən artıq müqəddəs ocağın mövcudiyyəti [Qafarov,A. 2007. s.33]. kimi həqiqətlər onun mənamərkəzli vəhdət siyasətində bir dəyər kimi tolerantlılığın da mühüm yeri olduğunu söyləməmizə əsas verir. Onun funkisiyonal və sensual vəhdət şüurunu özündə əksetdirən fikir və düşüncələri və bu istiqamətdə gördüyü işlər ölkəmizdə vətəndaş həmrəyliyinin və birliyinin yaranması və inkişaf etdirilməsi üçün həm teorik həm də praktik olaraq ciddi zəmin təşkil edir. Belə bir nəzəri və praktiki zəmin mahiyyəti etibarilə tarixi keçmişimizdən gələn mütərəqqi ənənənin izlərini daşıyır. Tolerantlıq və mədəni müxtəliflik olaraq bilinən bu irsin Heydər Əliyevin bu istiqamətdəki siyasi strategiyası ilə daha da inkişaf etdirilməsi bu gün dini-etiqadi zəmindəki münasibətlərin gərginləşdiyi və dini-etnik qarşıdurmanın vüsət aldığı bir dövrdə dünyanın digər xalq və cəmiyyətləri üçün bir nümunədir. Bu mənada, Azərbaycanın 2003-cü il üçün ABŞ Dövlət Departamentinin hesabatında dövlətimizin vətədaşların etiqad azadlığı haqqının təmin edilməsi sahəsində həyata keçirdiyi tədbir və qərarlarını tədqirəlayiq görməsi [H.mlf., “a.k.m.”, s.34.] Heydər Əliyevin həm dini, həm də milli-mənəvi dəyərlər istiqamətindəki siyasi fəaliyyətlərinin müvəffəqiyyətinə dəlalət edən əhəmiyyətli faktlardan biridir.

Heydər Əliyevin vətəndaş həmrəyliyinə xidmət edən funksional və sensual çağırışlı siyasi fəaliyyətində incə bir məqam daha vardı ki, o da ölkəmizdə sosial vəhdətin xarici təsir gücləri tərəfindən pozulabilmə ehtimalına qarşı aldığı tədbirlərdir. Onun bu istiqamətdə gördüyü tədbirlər həm funksional, həm də məna ətrafındakı həmrəylik şüurunun cəmiyyətimizdə dərin kök salaraq hər bir vətəndaşımız üçün bir həyat fəlsəfəsi halına gəlməsi baxımından böyük əhəmiyyət kəsb edir. Belə ki, Heydər Əliyevin bir cəmiyyətdə milli-mənəvi və xususilə də dini zəmində sosial vəhdətin və həmrəyliyin təmin edilməsi sahəsindəki siyasi fəaliyyətinin istiqamətlərindən birini də cəmiyyətin milli-mənəvi dəyərlər və xususilə də çox həssas məsələ olan din sahəsində mariflənd irilməsinin vacibliyi məsələsi təşkil edirdi. Bu xüsus milli-mənəvi dəyərlər sahəsindəki ideoloji təhlükəsizliyimiz üçün olduqca əhəmiyyətli idi. Mahiyyətcə dünyəvi dövlət prinsiplərini əsas alan Heydər Əliyev, dini maarifləndirmə sahəsində xüsusilə dini biliklərlə yanaşı müasir baxışı və elmi təfəkkürü ilə dünyəvilik prinsiplərinə cavab verəcək ilahiyyatçı alim və mütəxəssislərin yetişdirilməsinə əhəmiyyət verirdi. Onun bu istiqamətdəki siyasi kursunda donmuş və statik bir din anlayışına yer yox idi. Çünki dünyanın daima tərəqqi etdiyi, qloballaşma nəticəsində fərqli mədəniyyətləri təmsil edən insanların və qrupların eyni məkanda bir yerdə yaşadığı, bu mənada ölkəmizdə mədəni müxtəlifliyin getdikcə geniş vüsət aldığı bir dövrdə milli-mənəvi təhlukəsizliyimizin təmin edilməsində din kimi həssas bir sahədə dinamik elmi təfəkkürə ehtiyac var idi. Dini məsələlərin dərindən tədqiq edilməsi və yenidən improvizasiyası inkişaf mərhələsinə qədəm qoymuş ölkəmizin bu prosesdə özünəyadlaşmama cəhdi kimi qiymətləndirilə bilər. Bu xüsus, açıq şəkildə Heydər Əliyevin ifadələrində də öz əksini tapırdı. *“Biz heç bir zaman İslamı donmuş halda buraxmamalıyıq. Dünya tərəqqi etməkdə, cəmiyyətlər inkişaf etməkdədir. Ona görə də İslam donaraq əvvəlki halında qalmamalıdır. Fəqət bu, dinin əsaslarına və qoyduğu yolda onun ənənələrinə qarşı gəlmək mənasını daşımır. Tam tərsinə dünyaya gələn hər yeni nəsil öz köklərini daha da möhkəmləndirməlidir. Elə etməlidir ki, o köklər həmişə bəslənsin, inkişaf etsin, budaqlansın, donmuş halda qalmasın və çürüməsin”* [Qafarov,A. 2007. s.37]. Mərhum dövlət rəhbərimizin bu və bu qəbildən fikirləri dinimizin və milli mənəvi dəyərlərimizin ən mühüm əsaslarından birini təşkil edən Qurandan süzülüb gəlir. Belə ki, dinimiz Allahın da buyurduğu kimi *“kökü yedə sabit, budaqları göydə olan gözəl bir ağac”* [İbrahim, 14/24] kimidir. Kökü sabit olan bu ağacın budaqları Heydər Əliyevin siyasi fəaliyyətləri sayəsində bəhrə vermiş və bugün ölkəmizdə elmi təfəkkürə və dünyəvi vizyona sahib ilahiyyatçı alimlər yetişmişdir. Belə bir hal onun uzaqgörən

siyasətinin nəticəsi idi. Çünki o, dini maarifləndirmənin zəruriliyi ilə yanaşı bu sahədə akademik karyerası olan elm adamlarının yetişdirilməsinin zəruriliyinin də fərqində idi. Məlumdur ki, Azərbaycan həssas bölgədə yerləşir və buna görə də Heydər Əliyev din dövlət münasibətlərinin tənzimlənməsi və dövlətin dini ekstremizmə qarşı mübarizəsində qanunların yol verdiyi ölçüdə bəzi müvafiq ölkələrin təcrübəsindən istifadə etməyi ən optimal variantlardan biri olaraq gördü. Bu mənada o, məhz “bir millət, iki dövlət” olaraq gördüyü- Türkiyə Cümhiriyyəti ilə qarşılıqlı təcrübə alış-verişinə əhəmiyyət vermişdir ki, bu prosesin ondan sonra cənab Prezidentimiz İlham Əliyev tərəfindən də uğurla davam etdirildiyini görürük. Belə ki, ölkəmizdə Türkiyə və Azərbaycan dövlətlərinin müştərək fəaliyyətləri ilə Bakı Dövlət Universitetinin nəzdində fəaliyyət göstərən İlahiyyat fakültəsində ciddi mütəxəssislərin yetişdirilməsi məsələsinə Heydər Əliyev xüsusi diqqət ayırmışdır. 1997-ci ildə ilahiyyatçı magist dərəcəsində ilk məzunlarını verən bu fakültə dövlətimizə ilk töhfəsini vermişdir. Bu məzunlardan bir qismi daha sonra ilahiyyat sahəsində fəlsəfə doktorluğu dərəcəsi alaraq bu gün də dövlətimizin dini marifləndirmə istiqamətindəki siyasətinin reallaşdırılmasında əvəzsiz xidmətlər göstərməkdədirlər. Belə bir nəticə məhz Heydər Əliyevin din-dövlət münasibətləri sahəsindəki siyasətinin varmaq istədiyi hədəf idi. Çünki yalnız bu təqdirdə milli-mənəvi və dini zəmində sosial, funkisonal və sensual vəhdət canlılıq qazana bilərdi. Din duyğusu insanlarda yaradılışdan gələn bir duyğu olduğu üçün insanlar din adına nə ilə qarşılaşsalar onu din zənn edərlər. Bu səbəblə bu sahənin heç vaxt boş buraxılmaması və xaqlımızın dini zəmindəki vəhdəti xaosa çevirmək istəyən bəzi xarici mihraqlardan bəslənməməsi üçün Heydər Əliyev siyasi fəaliyyətlərində ilahiyyatçı alimlərin yetişdirilməsi məsələsini də daim diqqət mərkəzində tutmuşdur.

Onun milli-mənəvi təhlükəsizliyimi istiqamətində atdığı ən əhəmiyyətli siyasi addımlardan biri də Dini Qurumlarla İş Üzrə Dövlət Komitəsinin 21 iyun 2001-ci ildə 512 saylı Fərman əsasında təsis edilməsi hadisəsi idi. Bu qurumun Heydər Əliyev dövründən bugünə kimi ölkəmizdə din-dövlət münasibətlərinin tənzimlənməsi və ölkə daxilində milli-mənəvi dəyərlərlə əlaqədar funksional və sensual vəhdətin təmin edilməsi istiqamətində əvəzsiz xidmətləri olduğu inkar edilməzdir. Ölkəmizdə milli mənəvi vəhdət istiqamətində həyata keçirilən bütün bu kimi siyasi fəaliyyətlərə və nəticələrə əsaslanaraq deyə bilərik ki, istər ümummilli lider Heydər Əliyevin, istərsə də bugün cənab prezident İlham Əliyevin ictimai həmrəylik və buna bağlı olaraq dini-mənəvi dəyərlər istiqamətində atdığı təqdirəlayiq siyasi addımlar ölkəmizdəki ümumi sabitliyin ayrılmaz bir hissəsi kimi qiymətləndirilməlidir.

## 4.Nəticə

Hər bir xalqın özünüdərkində, milli özünəqayıdışında görkəmli şəxsiyyətlər həlledici rola mailkdirlər. Geniş xalq kütlələrini milli, dini, irqi, cinsi mənsubiyyətindən asılı olmayaraq, sözləri və əməli ilə ardınca apara bilən, onların əqlinə və hisslərinə təsir göstərmək gücünə malik olan şəxsiyyətlər liderdirlər. Çünki, bir cəmiyyətdə baş verən ictimai proseslərin mahiyyəti onun üzvü olan fərdlərin tənhalıq içində həbs etdikləri subyektiv yanaşmaları ilə çox vaxt tam dərk edilə bilmir. Belə bir məqamda cəmiyyətin uzaqgörən ziyalı liderlərinə ehtiyac yaranır. Ulu öndər Heydər Əliyev də müasir dövrdə siyasi-ictimai və mənəvi rəhbərliyi və ziyası ilə seçilən məhz belə şəxsiyyətlərdən biri idi. Etiraf edilməlidir ki, hər lider də ümumxalq, ümummilli rəhbər səviyyəsinə qalxıb ölkənin bütün əhalisini, millətin bütün övladlarını istər ölkənin daxilində, istərsə də dünyanın müxtəlif ölkələrində öz ətrafında birləşdirə bilmir. Heydər Əliyev məhz bu müqayisəolunmaz missiyanı həyata keçirə bilən və müstəqil dövlətçiliyimizin inkişaf yolunu müəyyənləşdirən dahi fenomenal şəxsiyyətdir.

Heydər Əliyev müstəqil dövlətçiliyimizin mənəvi əsası olaraq milli-mənəvi köklərimizə bağlılığa, nəsildən-nəslə ötürülən milli ənənələrə sadiqliyə çox böyük əhəmiyyət verirdi. O bu ümummilli vəzifədə ölkəmizin hər bir vətəndaşının üzərinə böyük məsuliyyət düşdüyünü qeyd edir, bu mənada, ümumiyyətlə xalqımızın ziyalılarının çox böyük rol oynaya biləcəklərini vurğulayırdı.

Kütləvi informasiya vasitələrinin və mətbuatın milli-mənəvi dəyərlərin aşılanmasındakı mühüm rolundan danışan Ümummilli Lider mətbuatın Vətənin bütün övladlarının, etnik mənsubiyyətindən asılı olmayaraq bütün Azərbaycan vətəndaşlarına vahid Vətən-Azərbaycan təəssübkeşliyini aşılamalı olduğunu, xalgın milli-mənəvi dəyərlərinin keşiyində durmalı, müasir dünyanın mütərəqqi dəyərlərini də mənimsəməyə, öyrənməyə yol göstərməlidirlər. Yaddan çıxarılmamalıdır ki, ulu öndərin siyasi kursunun əsasını təşkil edən Azərbaycançılıq ideologiyası məhz milliliklə ümumbəşəriliyin ayrılmaz vəhdətini nəzərdə tutur. Belə bir ideologiya ilə qloballaşma prosesində milli-mənəvi dəyərlərə söykənən milli xüsusiyyətlərin yad təsirlərə məruz qalaraq aşınmasının qarşısı alına, əriyib yox olması riskini azalda bilər.

Ölkəmizdə ictimai həmrəylik, dini-mənəvi həmrəylik və buna bağlı olaraq mənəvi dəyərlər istiqamətində həyata keçirilən bütün bu kimi siyasi fəaliyyətlərə və nəticələrə əsaslanaraq deyə bilərik ki, həm Heydər Əliyevin, həm də bugün cənab prezident İlham Əliyevin ictimai həmrəylik və dini-mənəvi dəyərlər istiqamətindəki siyasi fəaliyyətləri ölkəmizdəki ümumi

sabitliyin ayrılmaz bir hissəsi kimi qiymətləndirilməlidir. Müstəqilliyimizin son 16 ilində keçid dövrünün bütün çətinliklərinə baxmayaraq, prezidentimizin dəyərli tövsiyyə və göstərişlərini həyata keçirərək tarixi keçmişimizin çox qiymətli səhifələrini açıb xalqa göstərməyə çalışmaq yolunda uğulu addımlar ata bilmişik. Bu uğurların zirvəsini isə Azərbaycan Respublikasının Ali Baş Komandanı, Cənab İlham Əliyevin qətiyyətli siyasəti və xalqımızın şücaətli əsgər və zabitləri sayəsində fəth olunan Qarabağ və onun gözü olan Şuşa şanlı zəfər tariximizin qürurlu səhifəsidir. Çünki Qarabağ Azərbaycan xalqı üçün bir milli-mənəvi dəyər məsələsidir.

## ƏDƏBİYYAT

**1.** Çapcıoğlu, İ. (2016). Sosyo-kültürel bütünleşmede milli ve manevi değerlerin rolü: Mehmet Feyzi Efendi Örneği. *III. Uluslararası Şeyh Şa`ban-ı Veli Sempozyumu* (Editör: Prof.Dr. Ali Rafet Özkan). Kastamonu: 06-08 Mayıs, s.517.
**2.** Əliyev, H. (1996). Müstəqil Azərbaycan Respublikası gənclərinin birinci formunda çıxışı, *“Azərbaycan” qəzeti,* 3 fevral.
**3.** Fərabi (1986). *Ârâ`u əhli`l-mədînəti`l-fazıla* (nşr. Albert Nasri Nadir), Beyrut: Dârü’l-Məşriq.
**4.** Fərabi (1980). *əs-Siyasətu’l-mədəniyyə* (tərcümə: Mehmet Aydın, Abdükadir Şener və M. Rami Ayas), Ankara: Kültür Bakanlığı.
**5.** Qafarov, A. (2016). Felsefi ve dini açıdan birlikte yaşamanın temel değerleri üzerine bir analiz. *Değerler Eğitimi Dergisi, 14(31)*. İstanbul, Haziran, s.87-91.
**6.** Qafarov, A. (2007). Heydər Əliyev və din. *Heydər Əliyev və çağdaş Azərbaycan Dövlətçiliyi* (Editor: Səyyad Aran), İstanbul, Azərbaycan İstanbul Başkonsolosluğu, Kutup Yıldızı Nəşriyyatı, s.33-37
**7.** Günay, Ü. (2012). Toplumsal bütünləşmə və din. *Din sosiolojisi el kitabı* (ed. Niyazi Akyüz ve İhsan Çapcıoğlu). 3. Baskı, Ankara: Grafiker Nəşriyyatı, s.454-455.
**8.** İbn Miskəveyh (1978). *Təhzibu’l-əxlaq və tathiru’l-a‘raq*. nşr. İbnu’l-Hatîb y.y.: Matbaatü’l-asriyyə, (1398 AH).
**9.** Mücahid, H. T. (2005). *Fârâbî’den Abduh’a Siyasî Düşünce,* (Vecdi Akyüz, Çev.). İstanbul: İz Yayıncılık.
**10.** Orucov, H. (2007). Milli-mənəvi dəyərlərə qayıdış. *Heydər Əliyev və Azərbaycanda din siyasəti: gerçəkliklər və perspektivlər*. DQİDK, Bakı 3-4 aprel, s.72.

**11.** Skirbekk, G. & Gilje, N., (2006). *Antik Yunan'dan modern döneme felsefe tarihi* (tərcümə: Emrah Akbaşve Şule Mutlu). İstanbul: Kesit Yayınları.

## Идея общественной солидарности и значение религиозно-политических ценностей: философско-этический анализ государственной политики Гейдара Алиева

**Анар Гафаров***

**Абстракт.** Согласно личным, а также общественным аспектам, идеи и ценности являются значимыми понятиями. Обобщенное, обширное рассуждение этих понятий и объектов на протяжении истории философии, также не является случайным. Продолжение нравственного и политического существования общин предоставляется возможным, благодаря фильтрации и анализирования их своеобразных идей и ценностей. Это воззрение обогащает значение и актуальность исследования на тему: «Идея общественной солидарности и значение религиозно-политических ценностей: философско-этический анализ государственной политики Гейдара Алиева». Целью исследования является согласно политической стратегии Гейдара Алиева, философски и этически обосновать идею общественной солидарности и значение религиозно-политических ценностей. Метод исследования составляет повторное рассмотрение терминов и понятий, ранее отраженных в научных работах, посвященных предоставленной теме. Гейдар Алиев высоко оценивал привязанность к национально-нравственным корням, соблюдение национальных обычаев и считал эти данные нравственной основой суверенитета государственности. Именно такие выводы составляют главный тезис статьи. В связи с этим, именно идеология азербайджановедения предназначает неразрывное воссоединение национальности с общедоступностью. На нынешнем процессе глобализации такая идеология может препятствовать потере национальных особенностей, основанных на национально-нравственные устои и уменьшить риск их исчезновения.

* Доктор философии по философии, доцент,
Заведующий кафедрой «Религиоведения» Азербайджанского Теологического Института; Баку, Азербайджан
E-mail: anargafarov@ait.edu.az
https://orcid.org/0000-0002-3113-1287

**Цитировать статью:** Гафаров, А. [2023]. Идея общественной солидарности и значение религиозно-политических ценностей: философско-этический анализ государственной политики Гейдара Алиева. *Журнал «Metafizika», 6*(1), с.91-108.

***История статьи:***
*Статья поступила в редакцию: 12.01.2023*
*Отправлена на доработку: 10.02.2023*
*Принята для печати: 10.03.2023*

**Ключевые слова**: философия, Гейдар Алиев, национально-нравственные ценности, азербайджановедение, глобализация

## The idea of social solidarity and the importance of religious and moral values: Philosophical-ethical analysis at the level of Heydar Aliyev's state policy

**Anar Gafarov**[*]

**Abstract.** Ideas and values are important concepts in terms of both individual and social existence. It is no coincidence that these concepts have become the object of wide discussion in philosophy throughout history. Continuation of the moral and political existence of the societies is possible by analyzing the ideas and values specific to the societies. This point increases the importance and relevance of the study "The idea of social solidarity and the importance of religious and moral values: Philosophical-ethical analysis at the level of Heydar Aliyev's state policy". The purpose of the research is to justify the importance of the idea of social solidarity and religious and moral values from the aspect of Heydar Aliyev's political strategy on a philosophical and ethical basis. The method of the research is to reanalyze the terms and concepts related to the topic based on the evaluation and results of the previous research works. One of the main theses of the article is that Heydar Aliyev attached great importance to the attachment to our national and moral roots, loyalty to national traditions, which is the moral basis of our independent statehood. In this sense, the ideology of Azerbaijaniism implies the inseparable unity of nationality and universality. Such an ideology can prevent the erosion of national characteristics based on national and moral values in the process of globalization by exposure to foreign influences, and reduce the risk of melting and disappearing.

**Keywords:** Philosophy, Heydar Aliyev, National-Moral Values, The Idea of Azerbaijaniism, Globalization

## REFERENCES

**1.** Capcioglu, I. (2016). The role of national and spiritual values in socio-cultural integration: The Example of Mehmet Feyzi Efendi. *III.*

[*] Associate Professor,
Head of “Department of religious studies”, Azerbaijan Institute of Theology; Baku Azerbaijan
E-mail: anargafarov@ait.edu.az
https://orcid.org/0000-0002-3113-1287

**To cite this article:** Gafarov, A. [2023]. The idea of social solidarity and the importance of religious and moral values: Philosophical-ethical analysis at the level of Heydar Aliyev's state policy. *“Metafizika” journal, 6*(1), pp.91-108.

***Article history:***
*Received: 12.01.2023*
*Accepted: 10.03.2023*

*International Sheikh Şa`ban-ı Veli Symposium* (Editor: Prof. Dr. Ali Rafet Özkan). Kastamonu: 06-08 May, p.517.

**2.** Aliyev, H. (1996). Speech of the youth of the independent Republic of Azerbaijan in their first form, *"Azerbaijan" newspaper*, February 3.

**3.** Farabi (1986). *Ârâ`u əhli`l-mədînəti`l-fazıla* (nşr. Albert Nasri Nadir), Beirut: Dârü'l-Məşriq.

**4.** Farabi (1980). *əs-Siyasətu'l-mədəniyyə* (translated: Mehmet Aydın, Abdukadir Şener and M. Rami Ayas), Ankara: Ministry of Culture.

**5.** Gafarov, A. (2016). An analysis of the basic values of coexistence from a philosophical and religious point of view. *Journal of Values Education, 14(31).* Istanbul, Haziran, pp. 87-91.

**6.** Gafarov, A. (2007). Heydar Aliyev and religion. *Heydar Aliyev and contemporary Azerbaijani Statehood* (Editor: Sayyad Aran), Istanbul, Consulate General of Azerbaijan in Istanbul, Kutup Yıldızı Publishing House, pp. 33-37

**7.** Gunay, U. (2012). Social integration and religion. *Handbook of sociology of religion* (ed. Niyazi Akyüz and İhsan Çapcıoğlu). 3rd Edition, Ankara: Graphics Publication, pp.454-455.

**8.** Ibn Miskəveyh (1978). *Təhzibu'l-əxlaq ve tathiru'l-a'raq.* nr. Ibnu'l-Hatîb century: Matbaatü'l-asriyyə, (1398 AH).

**9.** Mujahid, H. T. (2005). *Political Thought from Farabi to Abduh* (Trans. Vecdi Akyüz). Istanbul: Iz Publishing.

**10.** Orujov, H. (2007). Return to national and moral values. *Heydar Aliyev and religious policy in Azerbaijan: realities and perspectives.* DQIDK, Baku April 3-4, p.72.

**11.** Skirbekk, G. & Gilje, N. (2006). *History of philosophy from Ancient Greece to the modern period* (Trans. Emrah Akbash & Shule Mutlu). Istanbul: Section Publications.